E-ISSN: 2674-5224

VOLUME 25 ISSUE 02 2023



ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

# KREDİT BAZARINDA BORC VƏSAİTLƏRİNİN YARADILMASININ ƏSAS MƏNBƏLƏRİ

**Hüseyn Eyvazlı**
Azərbaycan Dövlət İqtisadiyyat Universiteti, Maliyyə bölməsi, doktorantura, Email: huseyneyvazlı999@gmail.com

## XÜLASƏ

Sivil cəmiyyətimizin ən aktual məsələlərindən biri kredit bazarıdır. Kredit bazarı kreditorlar və borcalanlar arasında kreditlərin verilməsi, istifadəsi və bağlanması ilə bağlı münasibətlərin məcmusudur. Kredit bazarı bütövlükdə bazar iqtisadiyyatını sürətləndirən və hərəkətə gətirən əsas mexanizmdir. Kreditin verilməsi zamanı kreditor və borcalan arasında kredit münasibətləri yaranır. Kredit bazarı fərdi və müstəqil qərar qəbul edən təsərrüfat subyektləri arasında qarşılıqlı münasibətlərin formasıdır. Kredit bazarının fərqli xüsusiyyəti pulun burada məhsul kimi çıxış etməsidir. Kredit bazarı kredit kapitalı bazarının tərifinə əsaslanır. İkinci Dünya Müharibəsindən və texnologiyanın inkişafından sonra dünyada kredit bazarı anlayışı geniş yayılmışdır. Azərbaycanda kredit bazarı qədim tarixə malikdir. Lakin Azərbaycanda kredit bazarının əsas inkişaf dövrü müstəqillik əldə etdikdən sonraya təsadüf edir. Bu sahə dövlət tərəfindən prioritet sahə kimi seçilib və bu sahənin inkişafı üçün dövlət proqramları həyata keçirilib. Bunun nəticəsində ölkənin kredit bazarına yerli və xarici investisiya axını başladı.
Bank əmanətləri qəbul edən, müxtəlif kredit əməliyyatlarında bu əmanətlərdən ən səmərəli şəkildə istifadə etməyi qarşısına məqsəd qoyan və ya əsas fəaliyyəti müntəzəm olaraq kredit almaq və ya vermək olan iqtisadi qurumdur. Başqa sözlə desək, bank pul, kredit və kapitalla bağlı hər cür əməliyyatları həyata keçirən və tənzimləyən, fiziki və ya ictimai şəxslərin və təsərrüfat subyektlərinin bu sahədə hər cür ehtiyaclarını ödəmək üçün fəaliyyət göstərən təsərrüfat vahididir. Hər bir ölkənin iqtisadiyyatının inkişafının əsasını maliyyə münasibətləri təşkil edir. Maliyyə resurslarının dövriyyəsi və yenidən bölüşdürülməsi həm də maliyyənin dəyərini müəyyən edir və onun fəaliyyət dairəsini formalaşdırırdı. Bazar iqtisadiyyatının vəziyyətini nəzərə alsaq, maliyyə bazarı ölkədə bazar münasibətləri sisteminin tərkib hissəsidir. “Maliyyə bazarı” anlayışı inkişaf etmiş dünya təcrübəsinə və hər bir ölkənin iqtisadi inkişafının spesifik xüsusiyyətlərinə uyğun olaraq müxtəlif cür şərh edilə bilər.
Pul, depozit, kredit, valyuta, sığorta və pensiya bazarlarının maliyyə alətləri ilə təşkil edilən ticarət sistemini təmsil edir. Burada əsas rolu vəsait axınını sahiblərdən borcalanlara yönəldən maliyyə strukturları oynayır. Orada alətlər və qiymətli kağızlar əmtəə kimi istifadə olunur. Maliyyə bazarı, hər hansı digər bazar kimi, maliyyə resurslarının satıcıları və alıcıları arasında birbaşa əlaqə yaratmağa yönəlmişdir.
Buna görə də maliyyə bazarı kapitala tələb və təklifin formalaşması çərçivəsində kreditorlar və borcalanlar arasında vasitəçilərin köməyi ilə bir növ kapitalın qaytarılması mexanizmi sistemidir. Bu bir növ maliyyə dövriyyəsidir. Praktikada bu, vəsaitlərin sahiblərdən borcalanlara və əksinə hərəkətidir. Məqalədə kredit bazarlarında borc fondlarının yaradılmasının əsas mənbələri araşdırılır və tədqiqata cəlb edilir.
**Açar sözlər:** kredit bazarı, bank, vəsait, borc ehtiyatı, maliyyə,bazar iqtisadiyyatı

## Giriş

Kredit bazarı maliyyə bazarının seqmentlərindən biridir. Bu səbəbdən də gəlin, ilk öncə, maliyyə bazarı anlayışına diqqətimizi yönəldərək və kredit bazarı anlayışına aydınlıq gətirmək lazımdır. Maliyyə bazarı pul vəsaitlərinin hərəkətinin təşkilinin xüsusi forması olub, maliyyə münasibətləri sferasında alqı-satqı münasibətlərinin məcmusudur. Maliyyə bazarlarının yaranması obyektiv xarakter daşıyır və o, dövlətin, habelə müxtəlif təşkilati-hüquqi formaya malik olan müəssisələrin fəaliyyəti ilə əlaqədar olaraq inkişaf edir. Maliyyə bazarı elə bazar formasıdır ki, burada əmtəə kimi maliyyə resursları çıxış edir. Daha doğrusu, bu bazarda kredit resurslarının alqı-satqısı baş verir. Maliyyə bazarının yaranmasının zərurililiyinin əsas amillərindən biri maliyyə ehtiyatlarının bölgüsüdür. Maliyyə bazarının mahiyyəti və rolu onun yerinə yetirdiyi funksiyalarla müəyyən olunur.

**Məqsəd**
Tədqiqat mövzusunun məqsədi Azərbaycanda kredit bazarının mövcud vəziyyətinin araşdırılması və inkişaf potensiallarının təhlil yolu araşdırılmasıdır. Kredit bazarının inkişafının nəzəri-metodoloji məsələlərini araşdırmaq, Azərbaycanda kredit bazarının müasir vəziyyətinin təhlili və onun qiymətləndirilməsini təşkil etmək, kredit bazarının fəaliyyətinin təkmilləşdirilməsi və beynəlxalq standarta uyğunlaşdırılmasını təmin etmək tədqiqatın əsas məqsədini təşkil edir.

**Metodlar**
Məqalədə analiz və sintez metodlarından istifadə edilməklə ədəbiyyat təhlili aparılmış, habelə Məqalədə sintez, analiz, deduksiya, induksiya elmi tədqiqat metodlarından istifadə etməklə müəssisədən işçi axını ilə bağlı nəzəri məsələlər araşdırılmış və müşahidə metodundan istifadə edilməklə Azərbaycanda kredit bazarlarında borc vəsaitlərinin yaradılmasının əsas mənbələri praktiki olaraq araşdırılmışdır.
Maliyyə bazarının əsas funksiyaları araşdırarkən onu aşağıdakı kimi qruplaşdıra bilərik.

- tənzimləyici - dövlət idarəetmə orqanlarının və özünütənzimləmə təşkilatlarının köməyi ilə, ümumilikdə, bazarın tənzimlənməsi həyata keçirilir; bütün maliyyə bazarı iştirakçılarının məlumatlara tam və bərabər çıxışının təmin edilməsi
- bölgü - maliyyə bazarı alətlərinin dövriyyəsi vəsaitlərin iqtisadiyyatın bir sektorundan digərinə, bir bazar iştirakçısından digərinə, bir regiondan digərinə və eyni zamanda köçürülməsini təmin edir. Qısacası maliyyə resurslarının bölüşdürülməsinə təsir göstərir;
- kommersiya - maliyyə bazarında həyata keçirilir və əməliyyatın bütün iştirakçıları üçün baş tutan hadisədir.
- qiymətin müəyyən edilməsi - Maliyyə alətlərinin qiyməti azad rəqabət şəraitində bazarda tələb və təklifin təsiri ilə formalaşır. Maliyyə sistemi tərəfindən tənzimlənən resursların müxtəlif investisiyalara çevrilməsi prosesi də bu sektora daxildir.

Maliyyə bazarında, bilvasitə kredit ssistemində qısamüddətli borc kapitalı bazarları ilə uzunmüddətli kapital bazarları arasında fərqlənirilir.
“Kapital bazarı orta və uzunmüddətli kreditləri, həmçinin səhmlər və istiqrazları ehtiva edir. O, qiymətli kağızlar bazarına (orta və uzunmüddətli) orta və uzun- üddətli bank kreditləri bazarına bölünür. Qısamüddətli tələbatların təmin olunması üçün yüksək likvidlikli və aitlərin realizə olunduğu pul bazarından fərqli olaraq kapital bazarında maliyyə resurslarına olan uzunmüddətli tələbatlar ödənilir”(1)
Qısamüddətli kreditlərin uzadılması nadir hallar olur ki, onlar müəyyən müddətdən orta və uzunmüddətli, bəzən dövlət və ya bank zəmanəti ilə uzadılır. Nəticədə qlobal kredit bazarının


ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

seqmentləri arasında kapital axını baş verir. Bu tələb həm də kreditorlar və borcalanlar arasında qarşılıqlı əlaqələr zəminində formalaşan bazar münasibətlərinin nəticəsidir. Əməliyyat baxımından qlobal kredit bazarı biznesin davamlılığı və əlverişliliyi üçün kreditin toplanmasını, eyni zamanda yenidən bölüşdürülməsini asanlaşdıran bazar münasibətləri sistemidir. Tarixən bu sistem dünya bazarı və milli kapital bazarlarının beynəlxalq əməliyyatları əsasında yaranmışdır. Bundan sonra onların beynəlmiləlləşməsi və qloballaşması əsasında formalaşmışdır.
Dünya borc kapitalı bazarı 1960-cı illərdən etibarən bərpa olunur. Həmin dövrdən əvvəlki 40 il ərzində isə 1929-1933-cü illərdəki iqtisadi depressiya, İkinci Dünya Müharibəsi və valyuta məhdudiyyətləri səbəbindən dünya kredit və kapital nisbətən hərəkətsiz qalmışdı və bu da təbii hal idi.
Əvvəlcə kredit bazarı yavaş-yavaş və əsasən qlobal pul bazarı kimi inkişaf edirdi. 1950-ci illərin sonlarından etibarən kreditlərə tələbat yarandıqda qısamüddətli əməliyyatlar (bir ilə qədər) həyata keçirilməyə başladı. Sonralar kreditlərin bəzən 15 ilə qədər uzadılması, uzunmüddətli kreditlərə keçilməsi dünya kredit bazarında müəyyən gərginliklərə səbəb olmağa başlamışdı.
Dünya kredit, borc bazarında 1960-cı illərin sonlarında kreditlərin həcmi artdı və 1970-1990-cı illərdən etibarən borc kapitalı bazarının həcmi olduqca böyüdü. Bununla da dünya ölkələrində borc kapitalı bazarının əlaməti müəyyənləşdi: milli borc kapitalının xaricə, xarici bankın səlahiyyətinə verilməsi və ya xarici kapitalın ölkəyə cəlb edilməsi mərhələsi başlandı.
Xarici kreditlər adətən borcalanın valyutasına əsaslanır. 1950-ci illərin sonundan etibarən avro yavaş-yavaş beynəlxalq borc bazarında formalaşmağa başlayır və bəzi hallarda onun qeyri-sabitliyi zaman-zaman nəzərə çarpır. Avrobazar hazırda qlobal kredit bazarının bir hissəsidir ki, burada banklar avro ilə depozit və kredit sistemini tənzimləyir (5).
Avrovalyutalar, daha doğrusu beynəlxalq valyutalar qlobal bazarlarda fəaliyyət göstərsə də, milli valyutalar da adətən öz qiymətini qoruyub saxlayırlar.
Hazırda avro( euro) Avropanın bir çox ölkələrinin ümumi pul vahididir. 1999-cu ildən beynəlxalq maliyyə bazarına təqdim edilmiş bu pul vahidinin nağd əskinasları isə 2002-ci ilin 1 yanvarından dövriyyəyə buraxılmışdır. Beləliklə, Avro 1979-cu ildən 1998-ci ilə kimi avropa valyuta sistemində dövriyyədə olan Avropa valyuta vahidini (ECU) əvəz etdi.
Avronun rəsmi pul vahidi olduğu 20 ölkə bunlardır: Almaniya, Litva, Latviya, Xorvatiya, Estoniya,Fransa, Finlandiya, Sloveniya, Slovakiya, Portuqaliya, Yunanıstan, Belçika, Avstriya, Niderlanda, Malta, Lüksenburq, Kipr, İtaliya, İspaniya, İrlandiyadır. Bundan başqa avro 7-si Avropa ölkəsi olmaqla daha 9 ölkədə rəsmi valyutadır. 2006-cı ilin dekabrında dövriyyədə 610 milyard avro var idi. Bu dövriyyədə olan ABŞ dollarından dəyərcə çox idi.
Hazırda dünya kredit-borc bazarında da, biznes-kapital sistemində də əsas mövqeyə malik olan beynəlxalq valyuta hesab olunan dollar 1785-ci ildə ABŞ Konqresində qəbul edilmiş qərara görə ABŞ-ın rəsmi valyuta vahidi kimi qəbul edilmişdir. 1791-ci ildə isə ABŞ Mərkəzi Bankı yaradılmışdır. ABŞ Konqresi ABŞ Mərkəzi Bankını (The Bank of the United States) 20 illik bir müddət ərzində ABŞ Xəzinəsinin maliyyə təmsilçisi elan etmişdir. Bu bank hökumət adından mərkəzi bankın vəzifələrini icra edən ilk bank hesab olunur. Bu bank 1811-1816-cı illər istisna olmaqla 1913-cü ilə qədər fəaliyyət göstərmişdir.
Federal hökumət ölkə miqyasında ilk kağız pulu 1861-ci ildə dövriyyəyə buraxmışdır. Vətəndaş müharibəsinin maliyyə yükünü qarşılamaqda çətinlik çəkən ABŞ Konqresi ABŞ Xəzinəsinə faiz gəliri olmayan zəmanətsiz əsginas ixrac etməyə səlahiyyət verdi. Bu əsginaslara, rənglərinə görə “yaşıl” adı verildi. 1861-ci il tarixindən bu yana dövriyyəyə buraxılmış bütün ABŞ əsginasları hal-hazırda da istifadə olunurlar və üzərlərində yazılmış dəyərin qarşılığında qəbul edilirlər.

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 25 ISSUE 02 2023



1996-cı ildə saxta əsginasların istehsalının qarşısını almağa yönəlmiş bir sıra tədbirlər çərçivəsində ABŞ əsginaslarının, yəni dolların dizaynı 67 ildən sonra ilk dəfə olaraq önəmli şəkildə dəyişikliyə məruz qalmışdır. "Bu dəyişikliklərdən sonra tədavülə buraxılmış ilk yeni əsginas 1996-cı ildə tədavülə buraxılmış olan 100 dollarlıq əsginasdır. Bu dəyişikliklər 1997-ci ildə tədavülə buraxılmış olan 50 dollarlıq, 1998-ci ildə tədavülə buraxılmış olan 20 dollarlıq və 2000-ci ildə tədavülə buraxılmış olan 10 və 5 dollarlıq əsginaslarda da özünü göstərmişdir. Oyma (Gravür) və İstehsal Dairəsi saxta əsginas kəsilməsinin qarşısını almaq üçün yeddi ilə on ildən bir dizayn dəyişiklərinə gedəcəklərini bildirmişdir." (https://az.wikipedia.org/wiki/AB%C5%9E _dollar%C4%B1_tarixi)

Qeyd etmək lazımdır ki, hazırda dünya bank kapital bazarının çox böyük bir hissəsini təşkil edən dollar ABS hüdudlarından kənarda və ya azad bank zonasında yerləşən xarici banklarda istifadə olunsa da, onun bütün əməliyyatları ABŞ Nyu-Yorkda tənzimlənən bir sahədir (6).

ABŞ-ın hüdudlarından kənarda dollar əmanətləri XIX əsrin sonlarında, Avropa banklarındakı əmanətlər müqabilində rüblük veksellərin ödənilməsi ilə başladı. İndiki avro-dollar bazarından fərqli olan bəzi məqamlar var idi:

- o zaman beynəlxalq faiz dərəcələri yox idi;
- əməliyyatlar və iştirakçıların sayı az idi;
- dollar əmanətləri borcalanların əlinə keçdi və daha sonra ABŞ-da adətən başqalarına verilmədən istifadə edildi.

Avrovalyuta bazarı, hansı ki əvvəllər avrodollar bazarı kimi fəaliyyətdə idi, 1950-ci illərin sonunda qarşılıqlı bank əlaqələri əsasında yaradılmışdır. Tədricən, Avrovalyuta anlayışı ABŞ-ın hüdudlarından kənarda, eləcə də onun hüdudları daxilində sərbəst bank zonalarında xarici bankların istifadə etdiyi dollarları əhatə etməklə genişləndi. 1960-cı illərdən etibarən avrovalyuta bazarına digər böyük ölkələrin valyutaları daxil olmağa başladı.

Ölkələrdə xarici iqtisadi fəaliyyətin inkişafı avtovalyuta kapital borc bazarının da genişlənməsinə şərait yaratdı. Bundan başqa 1950-ci illərin sonundan 1960-cı illərin əvvəllərinə qədər banklara və firmalara mənfəət üçün öz vəsaitlərini xarici ölkələrə köçürməyə imkan verən milli qanunların yumşaldılması da onları öz banklarına investisiya qoymağa təşviq etdi. Bu üsul ilkin olaraq 1957-ci ildə faiz dərəcələrinin aşağı salındığı və 30 gündən az müddətə tələb olunan depozitlər üzrə faizlərin ödənilməsinin qadağan edildiyi ABŞ-da tətbiq edilmişdir. Nəticədə dollar sahiblərinin pullarını xaricə depozit qoyması sərfəli üsul olaraq müəyyənləşdi.

Bu məsələdə müxtəlif xarici bankların hesablarına köçürülən və ölkələrdə depozit-kredit əməliyyatları üçün istifadə olunan dolların mənşəyini də müəyyənləşdirməyə təsir edirdi. 1981-ci ildə Nyu-Yorkda azad bank zonasının yaradılması ilə ABŞ ərazisi də avrodollar bazarının coğrafiyasına daxil oldu.

Dünya kredit bazarının, o cümlədən Avropada kapital-borc bazarının xüsusiyyətlərinə nəzər salsaq, bir neçə nüansı müşahidə edə bilərik:




- Həcm məsələsi. 1960-cı ildə 2 milyard, 1964-cü ildə 20 milyarda qədər olduğu halda, 2000-ci illərin əvvəlində avrovalyuta bazarında əməliyyatların həcmi təxminən 6 trln imiş (2).
- Təşkilati fərqlər. Təşkilati baxımdan dünya kredit bazarı beynəlxalq iqtisadi münasibətlər kontekstində kredit kapitalının hərəkətinin həyata keçirildiyi maliyyə təşkilatlarının məcmusudur. Bunlara aşağıdakılar daxildir: özəl firmalar, banklar, birjalar, dövlət müəssisələri, hökumətlər və yerli hakimiyyət orqanları, beynəlxalq maliyyə institutları və s. Qlobal kredit bazarının təşkilati strukturu struktur müxtəlifliyinə görə bəzən dəyişən qlobal valyuta sistemi ilə müqayisədə kifayət qədər sabitdir.
- Borcalanların dünya kredit vəsaitləri bazarına çıxışının məhdudlaşdırılması. Bu bazarda əsas borcalanlar TMK-lar, TMB-lər, hökumətlər, beynəlxalq maliyyə institutlarıdır. Eyni zamanada inkişaf etməkdə olan ölkələrin və onların hökumətlərinin dünya bazarlarında borclanma miqdarı təxmin edilir. Bunlar əsasən birbaşa xarici investisiyalar və yardımlardır ki, ehtiyacı olan ölkələr beynəlxalq təşkilatların kreditlərindən istifadə edirlər və ya beynəlxalq banklara inkişaf etmiş ölkələrin borcalanlarından daha yüksək qiymətlər ödəməyə məcbur olurlar. Beləliklə, Beynəlxalq Valyuta Fondundan (BVF) və Beynəlxalq Yenidənqurma və İnkişaf Bankından (BBRD) kredit almış ölkələrin borcalanları dünya borc kapitalı bazarına çıxış əldə edirlər. Beynəlxalq Valyuta Fondunun (BVF) müvafiq qurumları da onlara kredit verir. Bununla da, istiqraz buraxılış bazarına asan çıxışı təmin edir.
- Əsas ölkələrin valyutalarının əməliyyat valyutaları kimi göstərilməsi. Getdikcə avronun bazar payı azalsa da, (1960-cı illərdə 80%-dən çox, 1980-ci illərdə 68%, 2000-ci illərin əvvəllərində 50%) ABŞ-da dollar üstünlük təşkil edir. Beləliklə, dünya kapital borc bazarında əməliyyatlar əsasən Avropa valyutasında avro, o cümlədən İsveçrə frankı, sterlinq və digər əsas valyutalarda aparılır.
- Texnologiyalardan istifadə etməklə müştəri ilə əlaqənin sadələşdirilmiş və təkmilləşdirilmiş prosesi. Hazırda maliyyə-bank sektorunda, xüsusilə də, kredit borc bazarında əməliyyatlar daha çox telefon, telefaks vasitəsilə həyata keçirilir. İnternet bankçılığın elektron texnologiyası dünyanın istənilən nöqtəsində iştirakçı ilə iş yerlərində xüsusi terminallar vasitəsilə məsafədən xidmət qaydasında əməliyyatlar həyata keçirməyə imkan verir.
- Milli valyutalarla müqayisə. Xarici valyuta, daha doğrusu avro ilə əməliyyatlar daha sərfəlidir. Belə ki, burada faiz dərəcəsi əmanətlərə nisbətən aşağıdır, avro kreditləri üzrə isə enişi qabaqlayır. Xüsusilə, valyuta məzənnəsində tez-tez dəyişiklik olan ölkələrdə kredit sistemində borcun xarici və daha sabit valyuta ilə olması əlverişlidir. Bu mövzuda qonşu Türkiyə Cümhuriyyətinin iqtisadiyyatını və məlum sektorunu nümunə göstərmək olar (3).

"Finansal piyasalar güvenilirlik esasına göre çalışmaktadır. Söz konusu piyasalardaki bir güven eksikliği bütün tasarruf sahiplerinin paralarını birden çekmesine ve bu piyasanın çökmesine neden olabilir. Dolayısıyla bu piyasalarda güvenilirliğin sağlanmasında devletin etkin denetleme görevini kusursuz bir şekilde yerine getirmesi şarttır. Ard arda finansal ve bankacılık krizleri yaşayan Türkiye'de bu piyasalarda etkin denetleme görevinin yapıldığı söylenemez. Dolayısıyla güvenilirlik tasarruflara devlet tarafından 0 geri ödeme garantisi verilerek kısmen sağlanabilmektedir. Bu garantiye rağmen bu piyasalardaki çarpıklığın ve kırılganlığın büyüklüğü sebebiyle belli aralıklarla finansal krizler yaşanmaktadır. Bankaların ve diğer mali kuruluşlar ile Türkiye gerçekleri dördüncü bölümde verileceği için burada daha fazla bahsedilmeyecektir." (7)

Maliyyə bazarında borcların yaranmasının əsas şərti təsərrüfat subyektləri və dövlət güzəştli şərtlərlə maliyyə vəsaitlərini borc götürmək və ya sərbəst vəsaitlərdən müvəqqəti istifadə etmək imkanı əldə edilməsidir. Maliyyə bazarı öz mahiyyətinə görə potensial satıcı və alıcıların, habelə

vasitəçi qurumların maraqlarını səmərəli şəkildə nəzərə almaq və həyata keçirmək üçün nəzərdə tutulmuşdur.
Bazar iqtisadiyyatı istehsalın səmərəli təşkili formasıdır. Bunu dünyanın bir çox ölkələrinin inkişaf təcrübəsi sübut edir. Azərbaycan Respublikası üçün də biznesin yeni üsulları maliyyə bazarını azad bazara çevirmək deməkdir ki, bu da potensial imkanlardan, ilk növbədə, ölkənin hərtərəfli inkişafını təmin edən imkanlardan istifadəni tələb edir. Bu mənada maliyyə bazarı elmi-texniki tərəqqi əsasında inkişaf edən, fərdi təşəbbüslərə və rəqabətə böyük əhəmiyyət verən, iqtisadiyyatın bütün sahələrini resurslarla və təminatla təmin edən və ümumi ictimai vəziyyətin, iqtisadi artımın lazımi səviyyəsinə nail olmaq üçün ictimai istehsalın unikal təşkili formasıdır.
Fikrimizcə, maliyyə bazarı dedikdə, ölkənin bütün pul ehtiyatlarının, eləcə də iqtisadiyyatın müxtəlif subyektlərindən müəyyən edilmiş resursa tələb və təklifin təsiri altında daim hərəkətdə olan pul resurslarının məcmusu başa düşülür. Lakin pul vəsaitləri və təsərrüfat subyektləri maliyyə aktivləri deyil, onlar yalnız pul vəsaitləri ilə təsərrüfat subyektləri arasında birbaşa əlaqə olduqda meydana çıxır. Deməli, maliyyə qiymətləri ilk növbədə iqtisadiyyatın müxtəlif subyektləri arasında sərbəst pul kapitalının və pul yığımlarının əməliyyatları, eləcə də yenidən bölüşdürülməsi və onların hərəkəti əsasında yaranan pul münasibətləridir.
“Maliyyə bazarını həm də ilkin və təkrar bazarların məcmusu kimi nəzərdən keçirmək, həmçinin milli və beynəlxalq bazarlara bölmək olar. İlkin bazar qiymətli kağızların emissiyası məqamında yaranır, onda maliyyə resursları formalaşır. Təkrar bazarlarında bu resurslar təkrar bölünür və özü də bir neçə dəfə. Təkrar bazarları, öz növbəsində, birja və qeyri-birja bazarlarına bölünür. Sonuncuda hər hansı səbəbdən birjada qiymətləndirilməyən qiymətli kağızların alışı-satışı (məsələn, banklar vasitəsilə) baş verir.”(4)
Kredit kapital bazarı, yəni qısa və uzunmüddətli bank kreditləri bank sistemində mövcud olan kredit formalarıdır. Ölkədə fəaliyyət göstərən kommersiya bankları onu ancaq etibarlı təhlükəsizlik və yüksək faizlə təmin edən qurumlardır. Əsas vəsaitlərin yaradılması və yenilənməsi üçün zəruri olan uzunmüddətli krediti yalnız dəyişən (dövri nəzərdən keçirilən) faiz dərəcəsi ilə əldə etmək olar.
Bəzi hallarda bir çox sahələrəin: istehsalat, sənaye, tikinti, ticarət, rabitə və ya digər sahibkarlıq fəaliyyətlərinə, daşınmaz əmlaka, əntiq əşyalara, qiymətli metallara, pensiya və sığorta fondlarına, müxtəlif qiymətli kağızlara investisiya üçün pul - xarici valyuta da bank kredit borclarının meydana gəlməsinə şərait yaradır. Eyni zamanda milli valyuta devalvasiyaya məruz qaldıqda da sözügedən məsələlərin ortaya çıxması labüddür.
Hazırda borc-kredit sistemində mövcud obyekt və predmetlər bunlardır.

Kredit münasibətləri




Haz;rda dünya kredit bazarında mövcud ən önəmli terminlərin izahını verməklə bu sektorun əsas mahiyyətini aydınlaşdırmaq olar.

E-ISSN: 2674-5224
VOLUME 25 ISSUE 02 2023



ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

**Maliyyə**

- Bu, fərdlərin və ya qurumların faydalana biləcəyi pul, fond və ya kapital deməkdir.
- Bunlar lazımi vəsaitlərin müvafiq şəraitdə təmin edilməsi və onlardan səmərəli istifadə edilməsi ilə bağlı fəaliyyətlərdir.
- Fond puldan daha genişdir. Buraya nağd pul, tələb olunan depozitlər və konvertasiya edilə bilən aktivlər daxildir.

***Maliyyələşdirmə***

- Müəssisə və ya qurumun ehtiyac duyduğu pul və ya kreditin təmin edilməsi fəaliyyəti.
- Maliyyə sektorunun pul tədavülü ilə məşğul olan aspekti.
- Müəssisələr investisiya, istehsal, satış və ehtiyat kimi fəaliyyətlərini həyata keçirmək üçün maliyyələşdirməyə ehtiyac duyurlar (2).

**Maliyyə meneceri və ya kreditor**

Maliyyə meneceri biznesin investisiya və maliyyə qərarlarına cavabdeh olan şəxsdir. Maliyyə meneceri maliyyə bazarında bəzən müxtəlif problemlərlə də üzləşə bilir. Lakin optimal yolların seçilməsi ilə dinamik və aktiv kreditlərin- borcların idarə olunmasını həyata keçirə bilən kreditorlar uğurlu və perspektiv maliyyə menecerləri hesab olunur.

Bazar iqtisadiyyatında yaranan bank borcları ölkəxarici olduğu kimi, ölkədaxili də ola bilər. Bu, təbii ki, ayrı-ayrı şirkətləri, təşkilatlar və ya fərdi sahibkarların fəaliyyəti nəticəsində meydana gəlir. Bu zaman optimal kapital strukturu müəyyənləşir ki, bu da zamanla biznesdən biznesə və eyni işdə dəyişə bilən dinamik bir struktur kimi qəbul edilməlidir. Optimal kapital strukturu kapitalın minimum dəyərini və şirkətin maksimum dəyərini təmin edəcək borc/kapital birləşməsi kimi müəyyən edilə bilər.

İqtisadiyyatda artıq vəsaitlərin maliyyələşdirilməmiş seqmentlərə köçürülməsini tənzimləyən bazar sistemidir.

1. Pul bazarı: Bir və ya bir ildən az müddətə vəsaitlərin dəyişdirildiyi maliyyə bazarıdır.
2. Kapital bazarı: Vəsaitlərin bir ildən çox müddətə mübadilə edildiyi maliyyə bazarları (müddətli)

Maliyyə bazarı bütünlükdə aşağıdakı şəkildə təsvir oluna bilər.




**Nəticə**

Yuxarıdakıları ümumiləşdirərək, maliyyə bazarının funksiyasını müəyyən edən ilkin şərtlərə aşağıdakı amilləri daxil etmək olar:

- maliyyə resurslarının yenidən bölüşdürülməsində dövlətin rolunun minimuma endirilməsi,
- inhisarçılığın məhdudlaşdırılması və rəqabətin inkişafı məqsədilə bütün mülkiyyət növlərinə malik sahibkarlıq subyektlərinin tam müstəqilliyinin təmin edilməsi;

- ölkənin mərkəzi bankının kredit fondundan büdcə kəsirinin maliyyələşdirilməsində istifadəni dayandırmaq və bu problemləri dövlət kreditləri, yəni istiqraz və digər öhdəliklər verməklə həll etmək;

“Mərkəzi Bank kredit təşkilatından köçürülməmiş vəsaitlərin məbləğini, eləcə də maliyyələşdirmənin iki misli dərəcəsindən artıq olmamaq şərtilə onun tərəfindən müəyyən edilmiş həcmdə cərimə ödənilməsini tələb etmək hüququna malikdir. Bank əməliyyatlarının həyata keçirilməsi hüququnu verən lisenziyanın ləğv edilməsi zamanı Mərkəzi Bankda depozitə qoyulmuş vəsaitlər kredit təşkilatının səhmdarlar və kreditorlar qarşısındakı öhdəliklərinin yerinə yetirilməsi üçün istifadə edilir.”

Hər bir ölkə öz potensial imkanlarını və xüsusiyyətlərini mümkün qədər dolğun şəkildə ortaya qoyan maliyyə bazarının strukturu ilə xarakterizə olunur, yəni nağd pul dövriyyəsi funksiyasını yerinə yetirən bazar və qısamüddətli elektron alətlər (veksellər, çeklər və s.) vasitəsilə.

Hazırda Respublikada inkişaf etmiş, bazar prinsiplərinə əsaslanan iki pilləli bank sistemi birinci pillədə Azərbaycan Respublikasının Mərkəzi Bankı, ikinci pillədə kommersiya bankları və bank olmayan kredit təşkilatları fəaliyyət göstərir, kapital və maliyyə sektorunda, kredit bazarında borc vəsaitlərini məhz bu qurumlar tənzimləyir.

Beləliklə, bank sistemi – Azərbaycan maliyyə sisteminin mühüm elementi sayılır. Bu gün banklar aktivlərinin və kapitalının həcminə, regional əhatəsinə görə digər maliyyə vasitəçilərini dəfələrlə üstələyir.

Ölkəmizdə fəaliyyət göstərən 42 özəl bankların isə ayrıca tarixləri mövcüddür. Bu bankların bəziləri öncələr digər ad ilə fəaliyyət göstərən, bəziləri isə bir neçə bankın birləşməsində yaranan banklardır.

## ƏDƏBIYYAT

1. Abbasov A., Rzayev R. Bank ishi ve elektron bankchiliq. – 2016, 109 s.
2. Abbasov A. Qiymetli kagızlar ve onlarla emeliyyatlar. – 2012, 360 s.
3. Azerbaycan Milli Odanish Sisteminin inkishaf tendensiyası: huquqi ve iqtisadi aspektlerin tehlili. – 2013, №10, s.80-87.
4. Azerbaycan Respublikasında «Banklar ve bank fealiyyati haqqında» qanun. – 2011.
5. Cabiyev R.M. Azerbaycanda bazar infrastrukturunun formalashması ve inkishafı. – 2014, s.190.
6. Karimov A., Babayev A. Qiymatli kagizlar bazari. – 2015, 290 s.
7. Mamedov Z. Azerbaycanda korporativ idaraetmə sistemi ve onun banklarda tetbiqi masalalari. // Qanun. – 2017, № 8, s.90-98.
8. Merkezi bank haqqinda Azerbaycan Respublikasinin qanunu. 10 dekabr 2011-ci il 24.
9. Sadiqov E. Azerbaycanin qiymetli kagız bazari ve onun inkishaf perspektivleri. – Sankt-Peterburq, 2018, s.189.

E-ISSN: 2674-5224
VOLUME 25 ISSUE 02 2023



ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

# ОСНОВНЫЕ ИСТОЧНИКИ СОЗДАНИЯ ДОЛГОВЫХ СРЕДСТВ НА КРЕДИТНОМ РЫНКЕ

**Гусейн Эйвазли**
Азербайджанский Государственный Экономический Университет, Раздел: Финансы, докторант
Электронная почта: huseyneyvazlı999@gmail.com

## РЕЗЮМЕ

Одним из самых актуальных вопросов нашего цивилизованного общества является кредитный рынок. Кредитный рынок представляет собой совокупность отношений между кредиторами и заемщиками, связанных с предоставлением, использованием и закрытием кредитов. Кредитный рынок является основным механизмом, ускоряющим и двигающим рыночную экономику в целом. При предоставлении кредита кредитор и заемщик вступают в кредитные отношения. Кредитный рынок представляет собой форму взаимоотношений между отдельными и самостоятельно принимающими решения хозяйствующими субъектами. Отличительной особенностью кредитного рынка является то, что товаром здесь выступают деньги. Кредитный рынок опирается на определение рынка ссудного капитала. После Второй мировой войны и развития технологий концепция кредитного рынка получила широкое распространение в мире. Кредитный рынок Азербайджана имеет древнюю историю. Однако основной период развития кредитного рынка в Азербайджане приходится на период после обретения независимости. Это месторождение было выбрано государством в качестве приоритетного, и для его развития были реализованы государственные программы. В результате этого начался приток местных и иностранных инвестиций на кредитный рынок страны.

Банк – экономическое учреждение, принимающее депозиты, стремящееся наиболее эффективно использовать эти депозиты в различных кредитных операциях или основной деятельностью которого является получение или выдача кредитов на регулярной основе. Иными словами, банк – это экономическая единица, которая осуществляет и регулирует все виды операций, связанных с деньгами, кредитом и капиталом, и действует для удовлетворения всевозможных потребностей физических или государственных лиц и хозяйствующих субъектов в этой сфере.

Финансовые отношения составляют основу развития экономики каждой страны. Обращение и перераспределение финансовых ресурсов также определяли ценность финансов и формировали сферу их деятельности. Учитывая состояние рыночной экономики, финансовый рынок является составной частью системы рыночных отношений в стране. Понятие «финансовый рынок» можно интерпретировать по-разному в зависимости от опыта развитых стран и особенностей экономического развития каждой страны.

Он представляет собой торговую систему, организованную финансовыми инструментами денежного, депозитного, кредитного, валютного, страхового и пенсионного рынков. Главную роль здесь играют финансовые структуры, направляющие потоки средств от собственников к заемщикам. Там в качестве товаров используются инструменты и ценные бумаги. Финансовый рынок, как и любой другой рынок, направлен на создание прямой связи между продавцами и покупателями финансовых ресурсов.

Поэтому финансовый рынок представляет собой своеобразную систему механизмов возврата капитала с помощью посредников между кредиторами и заемщиками в рамках формирования спроса и предложения на капитал. Это своего рода финансовый оборот. На практике это движение средств от собственников к заемщикам и наоборот. В статье исследуются и привлекаются к исследованию основные источники создания заемных средств на кредитных рынках.
**Ключевые слова:** кредитный рынок, банк, фонды, задолженность, финансы, рыночная экономика.

Publication history

Article received: 26.01.2023
Article accepted: 09.02.2023
Article published online: 20.02.2023
DOI suffix: 10.36962/PAHTEI25022023-112

E-ISSN: 2674-5224

123-137 VOLUME 25 ISSUE 02 2023



ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

# CAUSES OF EMERGENCE OF GEODYNAMICAL-TENSION FOCUSES IN THE SOUTHERN CASPIAN DEFLECTION (IN REPRESENTATION OF SHAMAKHI-ISMAYILLI ZONE)

**Humbet Veliyev[1], Aygun Sultanova[2], Seriyye Mirzeyeva[3], Elnur Isazade[4]**
[1]Teacher at Department Geophysics, Azerbaijan State Oil and Industry University
[2] Republican Seismic Survey Center of Azerbaijan National Academy of Sciences, Employee
[3]Doctoral student of the Geology Faculty of Baku State University
[4]Azerbaijan State Oil and Industry University, 2nd year Master Geophysics Department
Email: [1]humbat2007@mail.ru; [2]aygun.sultanova77mail.ru; [3]mirzeyevasr@yahoo.com; [4]isazadelnur@gmail.com

## ABSTRACT

Increasing the value of seismological research methods, along with other methods, in studying the deep geological structure of the regions and the geodynamic regime of the earth's crust. The analysis of spatio-temporal payments of earthquake hypocenters and other features of the seismic process provides additional information about the structure of the fault network and the main lines of the Earth's crust. Seismicity, fractal dimensions of the spatial distribution of earthquake epicenters, mechanisms of earthquake parameters and complex analysis of the stress state of the earth's crust on the southern slope of the Greater Caucasus are provided in the fourth seismic zone: Balaken-Zagatala, Sheki-Gabala, Shamakhi-Ismayilli, Absheron.
Gravimagnetic, seismic, electrical exploration and well research conducted in the territory of Azerbaijan revealed that the thickness of the sedimentary cover in established plans is more than 25 km and it is divided into blocks by tectonic faults [1]. So far, energy geophysical planning has revealed anticlinal and other shaped structures capable of collecting a large number of oil and gas in the sedimentary layer. Hydrocarbon reserves are highly demonstrated in the layer complexes of these structures, mainly in the Productive Layer sediments. In the last 25 years, Azeri, Guneshli, Chirag, Bahar, Bulla Deniz, Shah Deniz, Umid, Babek, Absheron, Karabakh, etc. deposits have been discovered and are currently being exploited. Apparatus geological, geophysical studies, creation and planning of very large oil and gas reserves in prospective structures in this region.
The territory of Azerbaijan is a seismoactive area with a complex geological-tectonic structure. A large number of destructive earthquakes have occurred here from the past until now (1139 Goy-Gol Ganja-Kepaz earthquake, 1669 Shamakhi earthquake, 1902 earthquake, etc.) and seismic activity continues today. During the activation of geodynamic potential, earthquakes, and wild volcanoes, a large number of tectonic fractures were created in the discovered prospective and exploited structures as an oil field, and anomalous changes of geophysical fields with active charge are now observed [2, 8]. Due to the influence of strong earthquakes, the physical and mechanical properties of the rocks in the layers in the oil fields are restored, and the devices of the logging diagrams of the same layers are marked differently.
The Shamakhi-Ismayilli geodynamic-tension zone of Azerbaijan is considered to be one of the zones where the seismic activity of the Caucasus is the highest and where intense earthquake foci are observed as a result of years of research. Over time, it has been recorded that seismic activity has increased in this zone. Deep tectonic processes recorded in the study area play an important role in the study of geodynamic stress in this area. The results of many years of research in the Shamakhi-Ismayilli zone allowed to determine a number of characteristic features of the

manifestation of the seismomagnetic effect and its dependence on the mechanism of the earthquake source. A comparative analysis of the locations and depths of the earthquake foci that occurred in the Ismayilli and Shamakhi zones shows that the earthquakes occurred in the lower part of the sedimentary cover layer and the upper part of the Granite layer. Those earthquakes occurred in the place of sharp change in the configuration of the sedimentary layer, in the place of tension with stress-deformation conditions, in the part where the intrusive mass is in contact.

In the article, information about anomalous changes in geomagnetic field voltage near earthquake centers is studied. As a result of the conducted research, the factors that create the basis for the accumulation of energy in geodynamic-tension centers and the occurrence of earthquakes are studied. It has also been shown that blocks and layer complexes change different places during horizontal movement in the Shamakhi-Ismayilli and Sheki-Zagatala geological sections on the southern slope of the Greater Caucasus and the density of tectonic faults is observed. In the map of epicenters of earthquakes in the territory of Azerbaijan and the cross-sections of the distribution of hypocenters by depth, it is observed that the seismic activity changes differently in the depth layers in the interval of 0-100 km. On the southern slope of the Greater Caucasus, in areas with a high density of tectonic faults, the main strong earthquakes occur at intervals of 7-15 km. Although the number of earthquakes occurring in the 3-5 km interval of the sedimentary layer in the upper parts of the section is large, the magnitude does not exceed the limit of $M \geq 4$. In the deep layers, it is noted that there are intrusive masses with deep roots close to the earth's surface as one of the factors that cause earthquake foci. The sedimentary layer complex moves horizontally and encounters intrusive masses, and the different speeds of the blocks and layer complexes create the basis for the formation of deformation centers in the sedimentary layer, the geodynamic-tension energy continues to increase gradually, and when it reaches a critical level, a tectonic rupture occurs and an earthquake occurs.

In the Shamakhi-Ismayilli, Sheki-Zagatala zone, geodynamic-tension centers are located near the contact part of intrusive masses, and strong earthquakes occur in such centers.

**Keywords**: intrusive mass, earthquake source, seismic activity, tectonic fault, horizontal displacement.

# CƏNUBİ XƏZƏR ÇÖKƏKLİYİNDƏ GEODİNAMİK-GƏRGİNLİK OCAQLARININ YARANMA SƏBƏBLƏRİ (ŞAMAXI-İSMAYILLI ZONASININ TİMSALINDA)

**Hümbət Vəliyev[1], Aygün Sultanova[2], Səriyyə Mirzəyeva, Elnur İsazadə[4]**

[1]Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, Geofizika kafedrasının müəllimi

[2]Azərbaycan Milli Elmlər Akademiyası, Respublika Seysmoloji Xidmət Mərkəzinin əməkdaşı

[3]Bakı Dövlət Universiteti, Geologiya fakültəsinin doktorantı,

[4]Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, Geofizika kafedrasının II kurs magistri

Email: [1]humbat2007@mail.ru; [2]aygun.sultanova77@mail.ru; [3]mirzeyevasr@yahoo.com; isazadelnur@gmail.com

## XÜLASƏ

Azərbaycanın Şamaxı-İsmayıllı geodinamik-gərginlik zonası illər boyu aparılmış tədqiqatlar nəticəsində Qafqazın seysmik aktivliyinin ən yüksək olduğu və intensiv zəlzələ ocaqlarının




müşahidə olunduğu zonalardan biri hesab olunur. Zaman keçdikcə bu zonada seysmik aktivliyin yüksəldiyi qeydə alınmışdır. Tədqiqat zonasında qeydə alınan dərin tektonik proseslər bu zonada geodinamik gərginliyin öyrənilməsində mühüm rol oynayır. Şamaxı-İsmayıllı zonasında uzun illər aparılan tədqiqatların nəticələri seysmomaqnit effektinin təzahürünün və onun zəlzələ mənbəyinin mexanizmindən asılılığının bir sıra xarakterik xüsusiyyətlərini müəyyən etməyə imkan vermişdir. İsmayıllı və Şamaxı zonalarında baş vermiş zəlzələ ocaqlarının yeri və dərinliklərinin müqayisəli təhlili göstərir ki, baş vermiş zəlzələlər Çökmə örtük qatının aşağı hissəsində Qranit qatın yuxarılarında baş vermişdir. Həmin zəlzələlər Çökmə qatın konfiqurasiyasının kəskin dəyişmə yerində, gərginlik-deformasiya şərait olan gərilmə yerində, intruziv kütlənin kontaktı olan hissədə olmuşdur.

Məqalədə zəlzələ ocaqlarının yaxınlığında geomaqnit sahə gərginliyinin anomal dəyişmələri haqqında məlumatlar öyrənilir. Aparılmış tədqiqatlar nəticəsində geodinamik-gərginlik ocaqlarında enerjinin toplanmasına və zəlzələlərin baş verməsinə zəmin yaradan amillər öyrənilir. Həmçinin Böyük Qafqazın cənub yamacında Şamaxı-İsmayıllı, Şəki-Zaqatala zonasında geoloji kəsilişlərində üfiqi hərəkət zamanı bloklar və lay kompleksləri fərqli yerlərini dəyişdiyi və tektonik qırılmaların sıxlığı müşahidə olunduğu göstərilmişdir. Azərbaycan ərazisində zəlzələlərin episentrlər xəritəsində və hiposentrlərin dərinlik üzrə paylanması kəsilişlərində 0-100 km intervalda seysmik aktivliyin dərinlik qatları üzrə fərqli dəyişdiyi müşahidə olunur. Böyük Qafqazın cənub yamacında tektonik qırılmaların sıxlığı çox olan sahələrdə əsas güclü zəlzələlər 7-15 km intervalında baş verir. Kəsilişin üst hissələrində Çökmə qatının 3-5 km intervalında baş verən zəlzələlərin sayı çox olsada maqnitudası M≥4 həddini aşmır. Dərin qatlarda isə zəlzələ ocaqlarının yaranmasına səbəb olan amillərdən biri kimi yer səthinə yaxın köklü intruziv kütlələr olduğu qeyd edilir. Çökmə qat kompleksi horizontal hərəkət edərək intruziv kütlələrlə qarşılaşır və blokların, lay komplekslərinin fərqli sürətləri çökmə qatda deformasiya ocaqları yaranmasına zəmin yaradır, geodinamik-gərginlik enerjisi tədricən artmaqda davam edir və kritik həddə çatanda tektonik qırılma olur, zəlzələ baş verir.

Şamaxı-İsmayıllı, Şəki-Zaqatala zonasında geodinamik-gərginlik ocaqları intruziv kütlələrin təmas hissəsinə yaxın yerləşir və güclü zəlzələlər belə ocaqlarda baş verir.

**Açar sözlər:** intruziv kütlə, zəlzələ ocağı, seysmik aktivlik, tektonik qırılma, horizontal yerdəyişmə.

## Giriş

Regionların dərin geoloji quruluşunun və yer qabığının geodinamik rejiminin öyrənilməsində digər üsullarla yanaşı seysmoloji tədqiqat metodlarının da əhəmiyyəti getdikcə artır. Zəlzələ hiposentrlərinin məkan-zaman paylanmasının və seysmik prosesin digər xüsusiyyətlərinin təhlili qırılmalar şəbəkəsi və Yer qabığının əsas sərhədlərinin strukturu haqqında kifayət qədər əlavə məlumat verir. Seysmiklik, zəlzələ episentrlərinin fəzada paylanmasının fraktal ölçüləri, zəlzələ mənbələrinin mexanizmləri və Böyük Qafqazın cənub yamacında yer qabığının gərginlik vəziyyətinin kompleks təhlili əsasında dörd seysmik zona müəyyən edilmişdir: Balakən -Zaqatala, Şəki-Qəbələ, Şamaxı-İsmayıllı, Abşeron.

Azərbaycan ərazisində aparılmış qravimaqnit, seysmik, elektrik kəşfiyyatı və quyu tədqiqat məlumatları əsasında qurulmuş xəritələrdə çökmə örtüyün qalınlığının 25 km-dən artıq olduğu və tektonik qırılmalarla bloklara ayrıldığı göstərilmişdir [1]. İndiyə kimi aparılan geofiziki planalmalarla çökmə qatda coxlu sayda neft-qaz toplana biləşək antiklinal və başqa formalı strukturlar aşkar edilmişdir. Bu strukturların lay komplekslərində, əsasəndə Məhsuldar Qat

çöküntülərində karbohidrogen ehtiyyatları çox zəngindir. Son 25 ildə Azəri, Günəşli, Çıraq, Bahar, Bulla dəniz, Şahdəniz, Ümid, Babək, Abşeron, Qarabağ və s. yataqları aşkar edilmiş və hazırda istismar olunur. Aparılan geoloji, geofiziki tədqiqatlar bu regionda olan perspektivli strukturlarda da çox böyük neft və qaz ehtiyyatlarının olduğuna proqnozlaşdırır.
Azərbaycan ərazisi həmçinin geoloji-tektonik quruluşu mürəkkəb olan seysmoaktiv ərazidir. Burada tarixi keçmişdən indiyə kimi çoxlu sayda dağıdıcı zəlzələlər baş vermişdir (1139 Göy-Göl Gəncə-Kəpəz zəlzələsi, Şamaxı 1669, 1902 zəlzələsi və s.) və seysmik aktivlik indidə davam edir. Aşkar olunmuş perspektivli və neft yatağı kimi istismar olunan strukturlarda, geodinamik proseslərin, zəlzələlərin, paçıq vulkanlarının aktivləşməsi zamanı çoxlu sayda tektonik qırılmalar yaranmış və indidə aktiv sahələrdə geofiziki sahələrin anomal dəyişmələri müşahidə olunur [2, 8].
Güclü zəlzələlərin təsirindən neft yataqlarında laylarda süxurların fiziki mexaniki xüsusiyyətlərində müəyyən dəyişikləkər yaranır, eyni layların karotaj dioqramlarının göstəriciləri fərqli qeyd edilir.

**Məqsəd**
Azərbaycan ərazisində dərinlik quruluşunun öyrənilməsi istiqamətində müsir geofiziki üsullarla planalma işləri aparılır, seysmik kəşfiyyat, seysmotomoqrafiya üsulları ilə güclü zəlzələlərdən (M≥5) yaranan seysmik dalğalarla Litosfer qatın müasir modelləri qurulur. Toplanmış yeni məlumatlar əsasında geodinamik-gərginlik ocaqlarında enerjinin toplanmasına və zəlzələlərin baş verməsinə zəmin yaradan amillərin müasir elmi dəlilərlə əsaslandırması **ən aktual** problemlərdən biri kimi öyrənilir.
Azərbaycan ərazisində Şamaxı-İsmayıllı zonasında zəlzələ ocaqlarının formalaşmasında intruziv kürlələrin rolunu müəyyən etmək, tektonik qırılmaların inkişaf dinamikasını əsaslandırmaq və gələcəkdədə güclü zəlzələnin olması ehtimalını qiymətləndirməkdir.

**Metodlar**
**Mifik təsəvvürlər.** İnsanlar qədim sivilizasiyalar dövründə kainat haqqında düşüncələrini, səmada müşahidə etdikləri təbii hadisələri öz təsəvürlərinə uyğun qayalara, daşlara həkk etmişlər. Antik insanlar kosmik fəzada, Günəşlə digər planetlərin əlaqəli olduğunu və baş verən dağıdıcı təbiət hadisələrini, zəlzələləri, vulkanları, tufanları və qeyri adi dəyişmələri anlamağa çalışmışlar. Dünyanın müxtəlif yerlərində qaya və mağaralarda aşkar olunmuş şəkillərdə Günəş təsviri və orada baş verən hadisənin yerə, canlı aləmə və insanlara təsirini əks etdirməyə çalışmışlar.
**Geoloji düşüncələr.** Geologiya elmi XIX əsrdə formalaşaraq inkişaf etmiş və Yerin əmələ gəlməsi, dərinlik quruluşu, süxurların tərkibi, vülkanların, zəlzələlərin baş verməsi, dağların, çökəkliklərin yaranması, faydalı qazıntıların mənşəyi və yataqların yaranması öyrənilmişdir. Geologiya elminin inkişafi ölçmə işlərinin, həndəsi, geodeziya ölçmələrinin təkamülü ilə müsir səviyyəyə çatmış və təbiət hadisələrinin baş vermə səbəblərini yeni nəzəriyyələr əsasında aydınlaşdırmağa çalışmışdır.
**Geosinklinal nəzəriyə.** Geoloji elmi XIX əsrin ikinci yarısından başlayaraq (Ceyms Xoll, 1857, Ceyms Dana 1873 və b.) inkişaf etmiş, geoloqlar geosinklinal strukturların əmələ gəlməsi haqqında fikirlərini yazmışdır (Emil Oqom, 1920). Geoloji məlumatlar, geodezik-nivelirləmə ölçmələri geostrukturların, dağ massivlərinin ucalması, çökəkliklərin enməsi, yəni şaquli-vertikal hərəkətlərin müşahidə olunması alimləri "Geosinklinal nəzəriyə"ni (Fiksizm tərəfdarları R.V. Bemmelen, E.Xaarman, R.Villis, V.V.Belausov və b.) inkişaf etdirməyə sövq etdirmişdir. 1930-60-cı illərdə geofiziki üsulların tədbiqi genişləndikcə geoloji məlumat bazası çoxaldıqca bir çox

E-ISSN: 2674-5224
VOLUME 25 ISSUE 02 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

regional proseslərin uzahını "Geosinklinal nəzəriyə"nin əsasında aydınlaşdırmaq inandırıcı olmurdu.

**Plitələr tektonikası nəzəriyyəsi.** Yerin daxilində baş verən geodinanik prosesləri litosfer plitələrinin bir-birinə nisbətən horizontal hərəkətləri əsasında aydınlaşdıran nəzəriyyə olmaqla okean çökəkliklərinin, dağ silsilələrinin yaranmasında, vulkan püskürmələrinin, zəlzələlərin baş vermə səbəbləri və s. izah olunur [1, 2, 4]. İlk dəfə 1920-ci ildə, tektonik blokların hərəkəti ideyasını Alfred Veqener söyləmiş və 1960-cı illərdən başlayaraq bu ideya "Plitələr tektonika" nəzəriyyəsi kimi inkişaf etdirilir (şəkil 1). Horizontal hərəkətləri ölçmək mümkün olduğundan (GPS - Global Positioning System – Глобальное Система Определение Местоположения) yeni məlumatlara istinadən plitələr tektonikası (Allen, M, J, Jackson, and R. Walker. 2004) nəzəriyyəsi əsasında plitələrin, tektonik blokların, iri geoloji strukturların zaman-məkan etibarilə horizontal hərəkətləri, fəza vəziyyəti, geodinamik-gərginlik şəraiti və müsahidə olunan seysmik aktivliyi "Plitələr tektonikası" nəzəriyyəsinə istinadən modelləşdirilməyə başlamışdır.

**Plyum mantiya nəzəriyyəsi.** Şaquli, üfiqi və dairəvi hərəkətlər əsasında geostruktur vahidlərin yaranmasını, vülkanik prosesləri, zəlzələlərin baş vermə səbəbləri seysmotomoqrafiya, qravitasiya, maqnit, elektrik sahələrin məlumatları əsasında modelləşdirilir [2, 7]. Yerin mantiya qatında yaranan dairəvi-burulğan formalı hərəkətlər nəticəsində iri geostrukturların yaranması, zəlzələlərin və maqmatik vulkanların baş vermə mexanizmi modelləşdirilir (şəkil 2).




**Şəkil 1.** "Plitələr tektonikası" modelinə uyğun Litosfer qatı plitələrinin hörizontal hərəkətlərinin təsviri sxemləri.




**Şəkil 2.** Mütəhərrik mantiya qatında dairəvi-burulğan formalı hərəkətlərin "Plyum mantiya" modelləri.

Plyum mantiya modeli Tuço Vilsonun 1965-ci ildə "plyum mantiya" nəzəri fikirlərinə uyğun Ş. Maruyama tərəfindən yaradılmışdır (Maruyama Sh., 1994; Грачев А.Ф., 1996). Geoloji keçmişdə nüvə-mantiya keçid zonasında yaranan həyacanlanma maqmaya oxşar plyumun yer səthinə hərəkətinə əsasən formalaşdırılmışdır (şəkil 3). Bu modellərdə: a) Plyum yer qabığına istiqamətlənmiş hərəkət edir və litosfer qatda şaquli və horizontal yerdəyişmələr yaradır; b) Plyumun hərəkəti zamanı spiralvari və müxtılif hərəkətlərlə mühitin geodinamik şəraiti dəyişir; c) Plyumun litosfer qatda soyumağa başlayır və böyük ölçülü morfostruktur yaranır. Bu geodinamik proseslər indidə davam edir. Nəticədə plyumun əhatəsində vülkanik proseslər aktivləşir, həmçinin müxtəlif dərinliklərdə geodinamik gərginlik ocaqları formalaşır və zəlzələlər olur [4,10].

**"Plitələrin meyllilik" nəzəriyyəsi.** Geosinklinal nəzəriyyədə şaquli hərəkətlər, Plitələr tektonikasında horizonral hərəkətlər, Plyum mantiya nəzəriyyəsində dairəvi-qövsvari hərəkətlər əsas pol oynadığı kimi "Plitələrin meyllilik" nəzəriyyəsində bu hərəkətlərlə yanaşı plitə müstəvisinin müəyyən bucaq altında radial-meylli hərəkətləri əsas pol oynayır (H.Ö.Vəliyev, 2021). Eyni plitə və ya blok müəyyən zaman keçdikdə müəyyən bucaq altında radial yerdəyişmə edir. Plitə müstəvisinin enən hissələrində mühitdə saquli sıxılma, müstəvisinin qalxan əks hissəsində genişlənmə prosesləri baş verir. Qeyd olunan radial-meylli hərəkətləri müşahidə etmək üçün Tiltimetrlərlə ölçmə aparılan daimi fəaliyyət göstərən məntəqələrdə uzun müddətli müşahidələr aparılmalıdır.




a)




b)

